## BİOLOGİYA VƏ AQRAR ELMLƏR

## BIOLOGICAL AND AGRARIAN SCIENCES

DOI: https://doi.org/10.36719/2707-1146/35/7-14

**Gülər Hüseynzadə**
ARETN Zoologiya İnstitutu
biologiya üzrə fəlsəfə doktoru
guler2000@yahoo.com
**Arifə Əliyeva**
ARETN Zoologiya İnstitutu
biologiya üzrə fəlsəfə doktoru
arifaaliyeva@gmail.com
**Lalə Rəhimli**
ARETN Zoologiya İnstitutu
biologiya üzrə fəlsəfə doktoru
lala_shirin84@mail.ru
**Aydın Məmmədov**
ARETN Zoologiya İnstitutu
aydin.aydin2021@mail.ru

# AZƏRBAYCANDA APİDAE (HYMENOPTERA, APOİDEA) FƏSİLƏSİ ARILARININ TROFİK ƏLAQƏLƏRİ VƏ ZOLAQLI ARILARIN SUTKALIQ AKTİVLİYİ

**Xülasə**

Məqalədə Azərbaycanda yayılmış Apidae fəsiləsi arıkimilərinin növ tərkibi (20 cinsə aid 231 növ) və trofik əlaqələri barədə məlumat verilir. 2 stasionar məntəqədə (Qazax rayonu, Dəmirçilər kəndi və Naxçıvan MR, Ordubad rayonu, Ağdərə) zolaqlı arıların yem toplamasının sutkalıq aktivliyi və abiotik amillərdən asılılığı öyrənilmişdir. Tədqiqat müddətində 1-ci məntəqədə 5, 2-ci məntəqədə 2 növ zolaqlı arı qeydə alınmışdır.Müəyyən edilmişdir ki, zolaqlı arıların ən aktiv uçuş saat $12^{00}$-$17^{00}$-dək müşahidə edilir. Havanın temperaturu 8-10 $^{0}$C olduqda onlar artıq işləyə bilirlər, amma stabil uçuş üçün optimal temperatur 22-24 $^{0}$C-dir. Həmçinin yüksək rütubətlilik şəraitində daha aktivdirlər.

***Açar sözlər:*** *arıkimilər, trofik əlaqələr, tozlanma, sutkalıq aktivlik, uçuş dinamikası*

**Gular Huseynzade**
MSERA Institute of Zoology
PhD in biology
guler2000@yahoo.com
**Arifa Aliyeva**
MSERA Institute of Zoology
PhD in biology
arifaaliyeva@gmail.com
**Lala Rahimli**
MSERA Institute of Zoology
PhD in biology
lala_shirin84@mail.ru
**Aydin Mammadov**
MSERA Institute of Zoology
aydin.aydin2021@mail.ru

# Trophic relationships of bees family of Apidae (Hymenoptera, Apoidea) in Azerbaijan and daily activity of bumblebees


## Abstract

The article provides information on the species composition (231 species belonging to 20 genera) and trophic relationships of Apidae family bees distributed in Azerbaijan. In 2 stationary locations (Gazakh region, Demirchilar village and Nakhchivan MR, Ordubad region, Aghdara), the daily activity of foraging of striped bees and its dependence on abiotic factors were studied. During the research period, 5 types of striped bees were recorded in the 1st station and 2 types in the 2nd station. It was determined that the most active flight of the striped bees is observed between 1200 and 1700 hours. They can already work when the air temperature is 8-10 0C, but the optimal temperature for stable flight is 22-24 0C. They are also more active in high humidity conditions.


***Keywords:*** *bee relationships, trophic relationships, pollination, daily activity, flight dynamics*

## Giriş

Aktiv tozlandırıcılar olan arıkimilər (Hymenoptera, Apidae) entomofil bitkilər olan bütün ekosistemlərin elementidir, boreal və dağ ekosistemlərində daha əhəmniyyətli rol oynayırlar, bir sıra morfo-ekoloji xüsusiyyətlərinə görə mühüm tozlandırıcılardır (Popov, 2007: 1). Azərbaycanda bu fəsilənin 3 yarımfəsiləsinin – Nomadinae, Xylocopinae və Apidae 231 növü yayılmışdır. Nomadinae yarımfəsiləsi arıları kleptoparazitik həyat tərzi keçirir və entomofil bitkilərin tozlanmasında iştirak etmir. Digər 2 yarımfəsiləyə aid arıların müxtəlif morfoloji və ekoloji uyğunlaşmaları hesabına əldə etdikləri nektar və tozcuqla qidalanması onlara ailənin bütün inkişaf dövrü boyu ekosistemlərin ehtiyatlarından maksimal istifadə etmək imkanı verir. Bu səbəbdən onlar effektiv tozlandırıcılardır.

Arıların sutkalıq aktivlik rejiminin öyrənilməsinin böyük əhəmiyyəti var, belə ki, bütün biotik və abiotik amillər yem toplayan işçi arılara təsir edir. Dağlıq iqlim şəraitində ekstremal yuxarı temperaturların olmaması (35 $^{0}$C-dən yüksək) və kifayət qədər yüksək rütubət günün bütün işıqlı saatlarında zolaqlı arıların yüksək aktivliyini stimullaşdırır. Sutkalıq yem toplama aktivliyini, tozlanmaya abiotik amillərin (temperatur, rütubət və buludluluq) təsirini öyrənmək məqsədilə 2 stasionar məntəqədə təsadüf edilən zolaqlı arılar üzərində tədqiqatlar aparılmışdır.

Material və metorika. 17.06-23.06.2021 tarixlərində Qazax rayonu (Dəmirçilər kəndi: N 41 05 19; E 45 15 55, h – 508 m ) və 06.07-13.07.2021-ci il tarixlərində Naxçıvan MR-nın Ordubad rayonunda (Ağdərə kəndində (N 39 06 37; E 45 54 50, h – 2000-2500 m) stasionar məntəqələrdə zolaqlı arıların sutkalıq aktivliyini müəyyən etmək məqsədilə səhər saat $5^{00}$-dan axşam $19^{00}$-dək hər 2 saatdan material toplanmışdır. Havanın temperaturu Naxçıvanda 32-42 $^{0}$C., Qazaxda 26-30 $^{0}$C qeydə alınmışdır.

Material toplanması ümumi entomoloji metodlarla, uçotu Yu.A. Pesenkonun metodikası əsasında (Pesenko, 1972: 91), növlərin təyinatı AMEA Zoologiya institutunun “Quru onurğasızları” laboratoriyasında Leica EZ4D mikroskopu altında «The determinant of insects of the European part of the USSR», P.H.Williams, Ç.D.Miçenerin təyinediciləri vasitəsilə aparılmışdır (Paul, Williams, 2008: 46-74, Michener, 2007: 207, Əliyev, 2013: 18).

Azərbaycanda Apidae fəsiləsinə mənsub 20 cinsə aid 231 növ aşkar edilmişdir 9 Cədvəl 1). Nomadinae yarımfəsiləsi növlərinin hamısı kleptoparazitdir və tozlanmada iştirak etmir, digər 2 yarımfəsilənin-Xylocopinae və Apinae növləri (153 növ) entomofil bitkilərin səmərəli tozlandırıcılarıdır.

**Cədvəl 1.**
**Azərbaycanın Apidae fəsiləsi arıları.**

| № | Yarımfəsilələr və cinslər | Növlərin sayı |
|---|---|---|
| **I** | Yarımfəsilə Nomadinae | |
| 1 | Cins Nomada | 70 |
| 2 | Cins Epeolus | 3 |
| 3 | Cins Biastes | 1 |
| 4 | Cins Pasites | 2 |
| 5 | Cins Ammobatoides | 2 |
| **II** | Yarımfəsilə Xylocopinae | |
| 6 | Cins Ceratina | 10 |
| 7 | Cins Xylocopa | 5 |
| **III** | Yarımfəsilə Apinae | |
| 8 | Cins Tetralonia | 17 |
| 9 | Cins Eucera | 16 |
| 10 | Cins Habropoda | 2 |
| 11 | Cins Clisodon | 2 |
| 12 | Cins Amegilla | 10 |
| 13 | Cins Paramegilla | 2 |
| 14 | Cins Heliophila (=Anthophora) | 2 |
| 15 | Cins Melecta | 3 |
| 16 | Cins Anthophora | 23 |
| 17 | Cins Pseudomelecta | 1 |
| 18 | Cins Thyreus | 3 |
| 19 | Cins Bombus | 48 |
| 20 | Cins Psithyrus | 9 |
| | Cəmi: | 231 |

2021-2023-cü illərdə aparılmış tədqiqatlar və ədəbiyyat məlumatları (Aliyev, 2005:284, Aliyev, Kamarli, 2008:200, Popov, 2009: 29, Aliyev, 2011: 68, Aliyev ,Huseynzade, 2018: 4, Aliyev, Huseynzade, 2018: 90) nəticəsində Xylocopinae və Apinae yarımfəsilələrinə mənsub növlərin trofik əlaqələri öyrənilmişdir (cədvəl 2).

**Cədvəl 2.**
**Xylocopinae və Apinae yarımfəsilələri cinsləri arıkimilərinin trofik əlaqələri.**

| **Cinslər** | **Bitki növləri** |
|---|---|
| ***Tetralonia*** | *Taraxacum stenolepium, Solidago virgaurea, Aster alpinus, Allium cepa, Cynoglossum officinale, Nonnea armeniaca, Echium rubrum, Verbascum cheiranthifolium, Brunella lacineata, Betonica grandiflora, Salvia glutinosa, Tilia cordata, Lavatera thuringica, Malva silvestris, Zygophullum atriplicoides, Peganum harmale, Carduus sp., Pyrus sp.,Trigonella cangellata, Medicago coerulla, Dorycnium intermedium, Convolvulus arvensis, Caletegia sepium, Dracacephalum ruyschionum, Tenerium hutcanicum, Thymus transcaucasicus, Sishymbrium irio, Echinops galaticus,Salvia tescuicola, Salvia verticilata, Oruganum vulgare, Odonthides glutinosa, Salix sp. Astragalus sp., Euphorbia helioscopia, Zygophyllum fabago, Inula cordata, Cirsium arvense, Pterocephalus plumosus, Taraxacum sp., Cephalaris syriaca, Malva mauritiana, M.neglecta, Althaea cannabina, Erodium cicutarium* |

| | |
|---|---|
| ***Eucera*** | *Trifolium campestre, Medicago lupulina, Securigera securidaca, Anthemis candidissima, Cirsium echinus, Minuartia hybrid, Anchusa italic, Hyachinthus orientalis, Inula glandulosa, Achilea micrantha, Caccinia rauwoifii, Verbascum georgicum, Veronica verna, Lepeta leptoclada, Brunella vulgaris, Betonica orientalis,Sorbus graeca, Lupinus sp., Genista transcaucasica, Medicago grandiflora, Melilotus nispolitanus, Lotus tenuis, Colutes cilicica, Astragalus sp., Onobrychis sp., Tilia caucasica, Physocaulis nodosa, Heliotropium suaveolens, Anchysa italica, Lycocsis orientalis, Myosotis collina, Verbascum thepsus, Celsia orientalis, Scrjphylaria rupestris, Digitalis nervosa, Nepeta tranacaucasica, Brunelia grandiflora, Salvia limbata, Cardamino impatiens, Tamarix florida, Lathyrus sphaca, Orobys palescens, Titrullus edulis, Cucurbita pepo, Inula helenium, Senecio othonnae, Allium viniale, Cerasus, Padus racemosa, Malcolmia crenulata, Vicia angustifolia, Coronilla varia, Trifolium arvense, Anthulis boissieri, Lamium album, Medicago orbicularis, Collega orientalis, Lathyrus aphaca, Symhytum caucasicum, Nonnea lutes, N.flavescens, Lamium maculatum, Ballota sp., Senecio coronoiflius, Carduus sp., Onophordon sp., Eryngium campestre, Cephalaria sutiaca.*<br>*Pyrus salixifornia, Vicia villosa, Rapistrum rugosum, Euphorbia vigata, Linum austriacum, Stachys recta, Salvia tesquicola, Argurolobium trigonelloides, Lotus corniculatus, Caragana grandiflora, Glycyrrhisa echinata, Andrachne blusciana, Euphorbia turcomanica, Saturea macranta, Muscari sp., Barbareae sp., Rosmorin sp., Astragalus sp., Onobrychis sp., Vicia balansaea, Cicer anatolicum, Orobus pellescens.* |
| ***Habropoda*** | *Lamiaceae* fəsiləsi bitkilərində oliqotrof |
| ***Amegilla*** | *Glycirrisa glabra, Teucrium parviflorum, Cucurbita perrum, C.maxima, Bryonia alba, Scrophularia rupestris, Echium vulgare, Eryngium nigromontanum, Caucalis daucoides, Lathyrus minuatus, Chrosophora tinetoria, Salvia limbata, Thalictrum minus, Medicago sativa, M.coerula, Vicia ancustifolia, Alhagi pseudoalhagi, Helianthys sp., Astragalus sp., Eryngium campestre, Salvia armeniaca, Ansnusa italica, Lycopsis orientalis, Carduus sp., Cichorium sp., Teucrium sp. , Zygophyllum fabago, obelia sp., Salsola crassa, S.pestifer, Verbascum cheiratifolia, Lotus tenuis, Symphytum caucasicum, Anthemis zamgellana, Onopordom sp., Delphinium freynii, Echium rubrum Salvia viridis, S.limbata, Lotus gebelis, Trifolium atrepenis, Scorronera latifolia, Centaurea dipressa, Zygophyllum fabago,Eryngium sp., Lathyrus odoratus, Vigna almensis, Zygophyllum atriplicoides, Z.fabago, Stachurus turkomanica,Euphorbia sp.* |
| ***Paramegilla*** | *Zygophyllum sp., Glycirrisa glabra, Centaurea depressa, Teucrium parviflorum, Eryngium sp., Carduus onopordoides, Onopordon sp., Scabiosae sp., Carduus thoermeri, Senecio orientalis, Achillea santolina, Taraxacum montanum, Cirsium incanum, Matriacaria sp., Lotus caucasicus, Isatis anceps, Capsella bursa-pastoris* |
| ***Heliophila (=Anthophora)*** | *Zygophyllum sp., Thymus superbus, Eryngium biebersteini, Carduus sp., Tartaxacum praticoluum, Achillea setacea, Solidago armena,*<br>*Symphytum caucasicum, Brassica repa, Cardamine uliginosa, Allysum campestre, Carduus sp., Cirsium sp., Leontodon asper. Barbareae minor, Cerasus avium, Pyrus colmunis, Nonnea picta. Pyrus communis, Cerasus avius, Barbareae minor, Padus racemose, Padus racemosa, Malus domestica, Pyrus communis, Delphinium sp., Astragalus ordubadensis, A.insidiosus, Veronica sp.,Rosmarin officinalis ,Auchusa sp.* |

| | |
|---|---|
| ***Melecta*** | *Euphorbia azerbajdzhanica, E.falcata, Onobrychis transcaucasica, O.atropatana, Trifolium caucasicum, T.arvense, Anchusa italica, Echium rubrum, Salvia grossheimii., Armeniaca vulgaris, Malus domestica, Pyrus comunis, Cerasus avium, C.vulgaris, Papaver sp., Barbareae minore, Salix sp., Londicera sp., Caragana grandiflora, Primus domestica, P.spinosa, Cydonis oblonga, Coronilla cretica, Tribulus terrestris, Astrantia maxima, Orlaya platycarpa, Nonnea rosea, N.picta, Moltkia coerula, Verbascum blattaria, Salvia armeniaca, Calamintha rotundifolia, Cucumis melo, C.sativus, Echballium elaterium, Inula cordata, Rubus sp., Orobus sp., Salvbia limbata, Lythum salicareae, Malcolmia sp., Trifolium repens, Oxytropis pilosa, Hippocripis biflora, Cynoglossum creticum, Symhytum asperum, Leonorus vullosa.* |
| ***Pseudomelecta*** | *Auchusa sp., Symphytum sp.,Malcolmia sp., Torularia contortuplicata, Rosmarin officinalis, Muscari sp., Veronica sp.,Peganum harmale,Salvia sp.,Trifolium sp., Lamiub alba, Veronica sp., Rhamnus sp., Astragalus bakuensis,Cephalaria sp., Medicago sativa, Centaurea sp., Mentha sp.,Astragalus ordubadensis, Stachys grossheimii, Carduus nervosus,Salvia spinosa, S.limbata, Teucrium polium, Eryngium sp., Barbareae minor, Lepidium draba.* |
| ***Thyreus*** | *Rosmarin officinalis, Muscare tenuifolium, Puachcinia scilloides, Asparagus verticillatus, Isatis subradiata, Sisymbrium bilobium, Padus racemosa, Lathyrus incurvus, Fiderites sp., Mellitotus albus, Geum rivali, Parnassia palistris, Zygophyllum atriplicoides, Tamarix ramocissima, Molcolmia sp., Melilotus officinalis, Anthyllis variegata, Colutea comarovii, Hedysarum sericeum, Cicer anatpolicum, Orobus pallescens, Lythyrum nyssopifolia, Solenanthus stamineus, Moosotis propincua, M.silvatica, Veronica gentianoides, Melanphyrum chlorostachyum, Lamium tomentosum, Cruganua creticum,Brassica campestris, Verbascum georgicum, Plantago saxatilis, Carduus thoermeri, Saturea laxiflora, Hedysarum farmosum, Alcea tabrisianna, Echium vulgare* |
| ***Cins Ceratina*** | *Echium altissimum, Melilotus albu, Carduus thecrmeri. Rubus sp., Ribes biebersteinii, Erysiumum collinum, Veronica nudicaulie, V.gentianoides, Allium rubellum, A.cepa, Leontodon asper, Eisymbrium loeselii, Jurinea subacaulis. Medicago sativa, Zygophyllum sp., Convolvus fischerianus, Campanulls grossheimii, Zygophyllum sp., Pegenum harmale, Eryngium nigromontanum, Euphorbia turkomenica, Erodium turmenum, Senecio arenaris, Calystegia sepium, Convolvulus sp., Echium sp., Carduus thoermeri, Anthomis oltissima, Citrulus edulis, Cucurbita pepo, Erysium repandum, Clematis orientalis, Delphinium sp., Alchimilla sericea, Poterium polyganum, Alcea rugosa, Scabiosae bipinuata, Myopsotis alpestris, Bunias orientalis, Isatis anceps, Veronica nudicanlis, Echium rubrum, Campanula grossheimii, C.erinus, Zygophyllum fabago, Glycirrhira echinata, Senecio coronopifolius, S.orientalis, Vaccaria segetalis,Taraxacum sp.* |
| ***Xylocopa*** | *Malva silvestris, M.neglecta, Medicago sativa, Trifolium campestre, T.spadiceum, Anthyllis variegata, Lamium album, Urtica urens, U.dioica, Acacia sp., Sorbus boissieri, Crataegus sp., Padus racemosa, Cotoniaster integerrima, Pyrus sp., Malus domestisa, Cerasus avium, Armeniaca vulgares, Onobryches sp., Tilia caucasica, Lavatera punctata, Cephalaria sp., Betonica grandiflora, Salvia verticellata, Calaminta caucasica, Bunias orientalis, Anthemis rudophiana, Senecio caucasicus, Allium rubellium, Syringa sp., Allium cepa, Lotus sp., Cephalaria syriaca, Scabiosae bipinnata, Tamarix sp.,* |

| | |
|---|---|
| | *Saxifraga tridactylites, Euphorbia sequieriana, Solidago armena, Trifolium sp., Acacia sp., Gledíteschia triacanthos, Robinia psuedoacacia, Colutea sp., Caragana grandiflora, Tilia cordata, Lavatera thuringiaca, Hippophae rhamnoides, Elaeagnus orientalis, Paliurus spina-christi, Rhamnus cathartica, Evonymus nanus, Zygophyllum sp., Carduus sp., Tamarix sp., Tanacetum sp.* |
| ***Bombus Psityrus*** | *Ranunculaceae (15növ), Rosaceae (23 növ), Crossulari-aceae (1 növ), Fabaceae (21 növ), Malvaceae (6 növ), Rhamnaceae (2 növ), Apiaceae (21 növ), Berberidasceae (2 növ), Adoxaceae (3 növ), Caprifoliaceae (12 növ), Boraginaceae (11 növ), Scrophularia-ceae (13 növ), Plantaginaceae (1 növ), Orobanchaceae (1 növ), Lamiaceae (24 növ), Asteraceae (26 növ), Urticaceae (1 növ), Melanthiacea (1 növ), Amaryllidaceae (1 növ), Zygophyllaceae (1 növ), Asphodelaceae (1 növ), Tiliaceae (5 növ), Brassicaceae (2 növ), Valerianaceae (2 növ), Acaciaceae (1 növ), Capparidaceae (1 növ), Liliaceae (13növ)* |

Müəyyən edilmişdir ki, Azərbaycanın Apidae arıları 27 fəsiləyə aid 300-ə yaxın çiçəkli bitkinin tozlanmasında iştirak edir.

Zolaqlı arıların sutkalıq uçuş aktivliyinin öyrənilməsi məqsədilə seçilmiş 2 stasionar məntəqədə tədqiqat aparılmışdır. Burada 7 növ zolaqlı arı qeydə alınmışdır: Naxçıvan MR, Ordubad rayonu, Ağdərədən *B.incertus, B.handlirscianus, B. subterraneus, B.shaposhniklovi, B.jonellus,* Qazax rayonunun Dəmirçilər kəndindən *B.argillaceus* və *B.zonatus* növləri. Göstərilən bu növlərin trofik əlaqələri aşağıda verilir:

*B.incertus Morawitz, 1881* arısı *Ranunculaceae, Rosaceae, Fabaceae, Apiaceae, Caprifoliaceae, Boraginaceae, Scrophulariaceae, Plantaginaceae, Orobancaceae, Lamiaceae, Asteraceae* fəsilələrinə aid bitkilərin tozcuq və nektarı ilə qidalanır.

*B.handlirschanus Vogt, 1909* arısı *Ranunculaceae* fəsiləsi bitkilərinin tozcuq və nektarı ilə qidalanır.

*B.subterraneus latreillellus Kirby, 1802* zolaqlı arısı *Apiaceae, Lamiaceae, Asteraceae, Boraginaceae* fəsilələrinə aid bitkilərin tozcuq və nektarı ilə qidalanır.

*B.shaposhniklovi Skorikov, 1910* arısı *Lamiaceae, Rosaceae, Elaeagnaceae Anacardiaceae Compositae Boraginaceae* fəsilələrinə aid bitkilərin tozcuq və nektarı ilə qidalanır.

*B.jonellus Kirby, 1802* arısı *Ranunculaceae* fəsiləsi bitkilərinin tozcuq və nektarı ilə qidalanır.

*B.argillaceus (Scopoli, 1763)* arısı *Ranunculaceae, Rosaceae, Fabaceae, Adoxaceae, Boraginaceae, Lamiaceae, Plantoginaceae, Orobanchaceae* fəsilələri bitkilərinin tozcuq və nektarı ilə qidalanır.

*B.zonatus Scorikov, 1935* arısı *Rosaceae, Fabacaeaae, Malvaceae, Valerianaceae, Caprifoliaceae, Boraginaceae, Scrophulariaceae, Plantoginaceae, Orobanchaceae, Lamiaceae, Crusifera (Brassicaceae), Asteraceae, Apiaceae* fəsiləsi bitkilərinin tozcuq və nektarı ilə qidalanır .

Dəmirçilər kəndində tədqiqatların aparıldığı həyətyanı sahədə müxtəlif meyvə ağacları (ərik, şaftalı, armud, albalı, gilas) və yabanı otlar (rozmarin, sarıçiçək və ya yabanı zəfəran, qanqal, zımbırtikan, gicitkan, vika və s.) üzərindən, Ağdərədə isə stasionarın ətrafında bitən çiçəkləyən moruq, çaytikanı, sumaq kolları, yabanı ot bitkiləri – çəmən adaçayı, kasnı, nanə, qanqal, *Heliotropuim europaeum*, kəklikotu, yarpız üzərindən arılar toplanmış və onların uçuşuna biotik amillərin təsiri öyrənilmişdir. Nəticələr Diaqram 1 və 2-də əks etdirilmişdir.

Dağlıq bölgələrdə çox yüksək temperaturlar ($35\ ^0$C-dən yuxarı ) olmadıqda və yüksək rütubətlilik şəraitində zolaqlı arılar bal arılarından fərqli olaraq çox erkən saatlardan (səhər 3-4-dən) başlayaraq axşam saatlarınadək ($20^{00}$-dək) uçur və aktiv işləyə bilirlər. Müşahidələr nəticəsində müəyyən edilmişdir ki, erkən saatlarda, nisbətən aşağı temperaturlarda (16-$18^0$C) çiçəklər üzərində şeh olduqda, alatoranlıqda, buludlu havada belə ancaq zolaqlı arılara təsadüf

edilir, çünki digər arılar əsasən qisa xortumludur və ancaq çiçəklər quruduqdan sonra, saat $11^{00}$-$12^{00}$ radələrində tozcuq və nektar toplaya bilir.

**Diaqram 1. Zolaqlı arıların sutkalıq aktivliyi**
**(Naxçıvan MR, Ordubad rayonu, Ağdərə, d.s.h 2000-2500 m., 08.07.2022)**




**Diaqram 2. Zolaqlı arıların sutkalıq aktivliyi**
**(Qazax rayonu, Dəmirçilər kəndi, d.s.h 580 m.,20.06.2022)**




Cədvəllərdən də göründüyü kimi ən aktiv uçuş saat $12^{00}$-$17^{00}$-dək müşahidə olunur. Havanın temperaturu 8-10 $^{0}$C olduqda onlar artıq işləyə bilirlər, amma stabil uçuş üçün optimal temperatur 22-24 $^{0}$C-dir. Həmçinin yüksək rütubətlilik şəraitində daha aktivdirlər.

Arıların sutkalıq aktivliyi bir sıra digər səbəblərdən də asılıdır, məsələn nektar və tozcuq toplanılan bitkilərin növündən, sutkanın işıqlı saatlarından, bitkinin günün hansı saatlarında maksimum nektar ifraz etməsindən, arı ailəsinin inkişaf mərhələsindən və arının hansı məqsədlə bitkilərə uçmasından, yəni nektar üçün, yoxsa tozcuq üçün uçur. Məsələn, söyüd ağaclarında ancaq ana arılara təsadüf edilir, çünki onlar söyüddən təkcə tozcuq götürürlər. Bu zaman işçi arılar və erkəklər isə çiçəkləyən digər bitkilərdən nektar toplayırlar.

## Nəticə

Azərbaycanda Apidae fəsiləsinə aid 3 yarımfəsilənin – Nomadinae, Xylocopinae və Apidae 231 növü yayılmışdır. Nomadinae yarımfəsiləsi arıları kleptoparazitik həyat tərzi keçirir və entomofil bitkilərin tozlanmasında iştirak etmir. Digər 2 yarımfəsiləyə aid arıların müxtəlif morfoloji və ekoloji uyğunlaşmaları hesabına əldə etdikləri nektar və tozcuqla qidalanması onlara ailənin bütün inkişaf dövrü boyu ekosistemlərin ehtiyatlarından maksimal istifadə etmək imkanı verir. Bu səbəbdən onlar effektiv tozlandırıcılardır.

Arıların sutkalıq aktivlik rejiminin öyrənilməsinin böyük əhəmiyyəti var, belə ki, bütün biotik və abiotik yem toplayan işçi arılara təsir edir. Stasionar şəraitdə Azərbaycanın 2 bölgəsində abiotik amillərdən temperatur, rütubət və buludluluğun arıların uçuş dinamikasına təsiri öyrənilmişdir. Müəyyən olunmuşdur ki, ən aktiv uçuş saat $12^{00}$-$17^{00}$-dək müşahidə olunur. Havanın temperaturu 8-10 $^{0}$C olduqda onlar artıq işləyə bilirlər, amma stabil uçuş üçün optimal temperatur 22-24 $^{0}$C-dir. Həmçinin arılar yüksək rütubətlilik şəraitində daha aktiv uçur, nektar və tozcuq toplayırlar.

## Ədəbiyyat

1. Popov, I.B. (2007). Troficheskiy konveyyer v zhizni shmeley (Hymenoptera,Apidae) v usloviyakh Krasnodarskogo kraya. Trudy Kubanskogo gosudarstvennogo agrarnogo universiteta, Vyp. №5 (9), Krasnodar, s.145-149.
2. Pesenko, Yu.A. (1972). K metodike kolichestvennykh uchetov nasekomykh-opyliteley. Ekologiya, № 1, s.89-95.
3. Opredelitel nasekomykh uvropeyskoy chasti SSSR. (1978). Tom 3, pod redaktsiyey G.S.Medvedeva, Leningrad, «Nauka»
4. Paul, H., Williams. (2008). A simplified subgeneric classification of the bumblebees (genus Bombus). Pierre Rasmont 4 Apidologie 39, p.46-74 .
5. Michener, C.D. (2007). The bees of the world, John Hopkins University Press, Baltimore, 207 p.
6. Əliyev, X.Ə. (2013). Azərbaycanın arıkimiləri. Doktorluq dissertasiyasının avtoreferatı.
7. Aliyev, H.A. (2005). On the ecology of bumble bees of the Talysh Region, Azerbaijan (Hymenoptera, Apoidea, Bombus). Beitrage zur Entomologie , v.55, № 2, p.279-288.
8. Aliyev, Kh.A., Kamarli, V.V. (2008). Bee pollinators of nectariferous in Azerbaijan. Proceedings of the Society of Zoologists of Azerbaijan, Volume 1, p.198-203.
9. Popov, I.P. (2009). Ecological characteristics of bumblebees of the North-Western Caucasicus. Synopsis of a thesis Ph.D. Biology. Rostov-Don, 27 p.
10. Aliyev, H.A. (2011). The Aculeate Hymenoptera in the collection of the Institute of Zoology of the NASA. Bakuş Part 3: Bees of the genus Nomada (Hymenoptera, Anthophoridae). Beitrage zur Entomologie, v.61, № 2, p.65-69.
11. Aliyev, Kh., Huseynzade, G. (2018). Flora specialization of bumblebees (Apidae, Bombus) of the Great Caucasus of Azerbaijan, Norwegian Journal of development of the International Science. № 20, p.3-8.
12. Aliyev, Kh. Huseynzade, G. (2018). Fauna and economic importance bee pollinators (Hymenoptera, Apoidea) of alfalfa in Azerbaijan. NASA Reports, volume LXXIV. № 1. Baku: "Science", p.89-92.

Göndərilib: 17.05.2023 Qəbul edilib: 22.07.2023

DOI: https://doi.org/10.36719/2707-1146/35/15-20

**Hümbət Hümbətov**
Azərbaycan Dövlət Aqrar Universiteti
aqrar elmlər üzrə fəlsəfə doktoru
humb@inbox.ru
**Arzu Babazadə**
Azərbaycan Dövlət Aqrar Universiteti
doktorant
arzu.babazade94@mail.ru
**Tünzalə İsgəndərova**
Gəncə Dövlət Universiteti
biologiya üzrə fəlsəfə doktoru
isgandarova65@mail.ru

# BİTKİ SIXLIĞININ ŞƏKƏR ÇUĞUNDURU KÖKÜMEYVƏSİNİN KEYFİYYƏTİNƏ TƏSİRİ

**Xülasə**

Ədəbiyyat materiallarından məlum oldu ki, şəkər çuğunduru və onun emalından alınmış məhsullar üzvi və qeyri-üzvi maddələrlə zəngindir. Şəkər çuğunduru nəinki qida sənayesində, həmçinin heyvandarlığın inkişafı baxımından yem istehsalında, spirt sənayesində və digər sahələrdə istifadə olunan keyfiyyətli xammaldır. Şəkər çuğunduru karbohidratların nümayəndəsi olan saxaroza ilə daha zəngindir.

Protopektinlə zəngin olan şəkər çuğundurundan yüksək keyfiyyətli şəkər istehsal etmək mümkün deyildir. Protopektin suda pis həll olduğuna görə şirədə bulanıqlıq əmələ gətirir. Bu da hazır məhsulun keyfiyyətinə mənfi təsir göstərir. Yetişməmiş şəkər çuğundurundan fərqli olaraq yetişmişdən alınmış şirənin tərkibində demək olar ki, protopektin olmur. Şəkər çuğundurun emalı prosesində müxtəlif çevrilmələrə məruz qalaraq aminturşuların, aminlərin və amidlərin sintezində iştirak edirlər. Amidlər karboksil qrupunun OH-nın amin qrupu ($NH_2$) ilə əvəz olunması hesabına əmələ gəlirlər.

Şəkər çuğunduru yarıməvəzolunan aminturşularla da zəngindir. İnsan və heyvan orqanizminin onlara olan ehtiyacı qismən ödənilir və ancaq müəyyən hissəsi isə qida hesabına ödənilir. Yarıməvəzolunan aminturşularına arginin, tirozin və histidin aid edilir.

***Açar sözlər:*** *şəkər çuğunduru, bitki sıxlığı, kökümeyvə, pektin maddələri, zülallar, sellüloz, amin turşuları*

**Humbat Humbatov**
Azerbaijan State Agrarian University
PhD in agricultural sciences
humb@inbox.ru
**Arzu Babazadeh**
Azerbaijan State Agrarian University
PhD student
arzu.babazade94@mail.com
**Tunzala Iskandarova**
Ganja State University
PhD in biology
isgandarova65@mail.ru

## Effect of plant density on sugar beet fruit quality


### Abstract

It was found out from the literature that sugar beet and the products obtained from its processing are rich in organic and inorganic substances. Sugar beet is a quality raw material used not only in the food industry, but also in feed production, alcohol industry and other fields in terms of animal husbandry development. Sugar beet is richer in sucrose, which is a representative of carbohydrates.

It is impossible to produce high-quality sugar from sugar beets, which are rich in protopectin. Because protopectin is poorly soluble in water, it causes turbidity in the juice. This has a negative effect on the quality of the finished product. Unlike unripe sugar beet, the juice obtained from ripe sugar beet contains almost no protopectin.

They participate in the synthesis of amino acids, amines and amides by undergoing various transformations during the sugar beet processing process. Amides are formed due to the substitution of OH of the carboxyl group with an amino group (NH2).

Sugar beet is also rich in semi-substituted amino acids. The human and animal body's need for them is partially met, and only a certain part is met through food. Semi-metabolized amino acids include arginine, tyrosine and histidine.


***Keywords:*** *sugar beet, plant density, root fruit, pectin substances, proteins, cellulose, amino acids*

### Giriş

Şəkər çuğunduru kökünün tərkibindəki azotlu maddələrin 60%-ni xam və mürəkkəb növlü zülallar təşkil edir, qalan 40%-i isə qeyri-zülali azotlu maddələrdən, o cümlədən monosaxarid, pektin maddələr, üzvü turşular, yağ, saponin və sairələrdən ibarətdir (Həsənov, Həsənova, 2010:176).

Hər 100 kq meyvəkökdə orta hesabla 5 kq ət hissəsi, 2,9 kq birləşmiş su, 92,1 kq normal şirə, normal şirədə isə 20 kq quru maddə, o cümlədən 17,5 kq xalis şəkər (saxaroza), suda həll olunan 2,5 kq "qeyri-şəkərli" maddələr vardır (Yusifov, Məmmədov, Qasımov, Rzayev, 2013:302).

Şəkər çuğunduru köklərinin tərkibində quru maddə və şəkərin miqdarını faizlə təyin etdikdən sonra onun şirəsinin keyfiyyətini faiz üzrə bilmək olar. Məsələn, əgər emal edilmiş normal şəkər çuğunduru şirəsində quru maddə 25,1%, şirədə isə şəkərin miqdarı 20,1% olarsa, onda aşağıdakı düstur üzrə şirənin keyfiyyəti faizlə belə ifadə edilər.

$$\frac{20{,}1*100}{25{,}1} = 80{,}07\%$$

Şirə külünün tərkibində kalium, natrium, maqnezium və fosfor duzları talpılır, kökün ət hissəsindəki küldə isə kalsium, maqnezium, dəmir və alüminium duzları vardır. Kökün müxtəlif hissələrində şəkərin miqdarı bərabər deyildir: "başcıq" hissəsində və aşağı "quyruq" adlanan hissəsində şəkər miqdarca az toplanır, ən orta "boyuncuq" adlanan hissəsində isə şəkər çox olur (Hümbətov, Xəlilov, 2010: 83 ).

Çuğundur bitkisinin yaşıl yarpaqlarında 78-85%-ə qədər su toplandığı halda, qurumuş yarpaqlarda suyun miqdarı 15-22%-ə çatır; başqa kimyəvi maddələrdən kül 1,3-2,7%, sellüloz 2%, azotsuz ekstraktiv maddələr (hidrokarbonlar) 9-15%, azotlu maddələr isə 2%-ə qədər olur (Məmmədov, İsmayılov, 2012: 356).

Ədəbiyyat məlumatlarının təhlilindən məlum olmuşdur ki, son zamanlar diffuziya şirəsinin tərkibində dekstranları təmizləmək üçün dekstranaza ferment preparatından istifadə olunur. Bu üsul diffuziya şirəsindən dekstranların təmizlənməsinə xeyli müsbət təsir göstərir.

Şəkər çuğundurunun tərkibində polisaxaridlərdən levana təsadüf olunur. Dekstrandan fərqli olaraq levan D-fruktoza molekullarının bir-birilə β-2→6 qlikozid rabitəsi hesabına yaranır (Hümbətov, Məmmədov, Qəbilov, 2014: 328).

**Pektin maddələri.** Şəkər çuğunduru polisaxaridlərin nümayəndəsi olan pektin maddələri ilə də zəngindir. Pektin maddələri şəkər istehsalı prosesində mühüm texnoloji əhəmiyyətə malikdir. Pektin maddələrinin şəkər çuğundurunda çox olması arzuolunmazdır.

Ədəbiyyat materiallarının və apardığımız tədqiqat isinin təhlilindən məlum olmuşdur ki, şəkər çuğundurundan ayrılmış şirədə turş mühitin yaradılması şəkərin, daha doğrusu saxarozanın sürətlə inversiya olunaraq qlükozaya və fruktozaya çevrilməsinə şərait yaradır. Bu da şəkər sənayesində külli miqdarda itkilərin əmələ gəlməsinə səbəb olduğu üçün arzuolunmazdır.

**Sellüloz.** Şəkər çuğundurun tərkibində sellüloza da təsadüf olunur. Onun ümumi empirik formulu ($C_6H_{10}O_5$) n-dir. Nişastadan fərqli olaraq sellüloz β -D-qlükopiranozanın bir-birilə birləşməsindən əmələ gəlir. Sellülozda β-qlükoza molekulları 1,4-qlikozid rabitəsi şəklində birləşir. Sellüloz bitkilər aləmində ən geniş yayılmış polisaxariddir. O bütün bitkilərin tərkibində olur. Bitkilərin oduncaq hissəsi əsasən sellülozdan təşkil olunmuşdur. Şəkər çuğundurunun yarpağında, qabığında və lətində sellüloza rast gəlinir. Yetişmiş şəkər çuğunduru ilə müqayisədə yetişməmişdə sellüloz daha çox olur. Yetişmiş şəkər çuğundurundan alınmış şirənin tərkibində yetişməmişə nisbətən daha az sellüloz olur. Sellüloz şirəyə diffuziya prosesi zamanı şəkər çuğundurunun bərk hissəciklərindən keçir. Sellüloz suda həll olmur. Şirədə isə müəyyən dərəcədə qeyri-şəffaflıq əmələ gətirir. Şirənin əhənglənməsi prosesində sellüloz, demək olar ki, tamamilə çökür və ya süzgəcdə qalır (Qorçiyeva, 2015:15).

**Azotlu maddələr.** Şəkər çuğundurunun tərkibində azotlu maddələrin mineral

və üzvi formalarına da təsadüf olunur. Şəkər çuğundurunda azotlu maddələrin miqdarı torpaqda olan azotdan, istifadə olunan azot gübrəsindən, sortun xüsusiyyətindən və digər faktorlardan asılıdır. Şəkər çuğunduru əkilmiş torpaqlarda azotlu maddələrin miqdarca çox olması onun məhsuldarlığının aşağı düşməsinə səbəb olmaqla yanası, onun yetişməsi prosesini də ləngidir. Şəkər çuğundurunun tərkibində azotlu maddələrin çox olması onun soyuğa davamsızlığını, zərərvericilərə və xəstəliklərə qarsı müqavimətinin zəif olmasına şərait yaradır. Bundan başqa şəkər çuğundurundan alınmış şirədə şəkər faizinin az olması onun tərkibində azotlu maddələrin miqdarca çox olması ilə izah olunur. Ona görə də şəkər istehsalı prosesində şəkər çuğundurunun əkilib becərilməsi zamanı elə sortlardan istifadə olunmalıdır ki, onların tərkibində azotlu maddələrin miqdarı az olsun.

Şəkər çuğundurunun tərkibində üzvi azot formasından amin turşulara, amidlərə, aminlərə, peptidlərə, zülallara və digər azotlu maddələrə təsadüf olunur. Bu göstəricilərin şəkər çuğundurunda, o cümlədən ondan alınmış şirənin tərkibində az və ya çox olması məhsulun yetişmə dərəcəsindən, ekoloji durumundan, torpaq-iqlim şəraitindən, istifadə olunan gübrədən, istehsal texnologiyasından və digər göstəricilərdən asılıdır. Şəkər çuğundurunda ümumi azotun miqdarı $0{,}12 \div 0{,}16$ $mq/dm^3$ olur.

Ədəbiyyat mənbələrinin araşdırılmasından məlum olmuşdur ki, şəkər çuğundurunun emalından alınmış tullantıda əvəzolunmayan və yarıməvəzolunan aminturşuları azlıq təşkil etdikdə, ondan heyvanların qidası üçün hazırlanmış yemə əlavə olaraq aminturşuları qatılır.

Şəkər çuğundurunun tərkibində, demək olar ki, bütün əvəzolunan aminturşuları mövcuddur. Adından göründüyü kimi, əvəzolunan aminturşuları insan orqanizmi tərəfindən sintez olunmaq qabiliyyətinə malikdir. İnsanlardan fərqli olaraq bitkilər zülalların tərkibində olan bütün aminturşuları sintez etmək qabiliyyətinə malikdir.

Bitki mənşəli məhsulların nümayəndəsi olan şəkər çuğundurunun tərkibində bütün əvəzolunmayan, yarıməvəzolunan və əvəzolunan aminturşuları sintez olunur.

Sadə amidlər ($R\text{-}COOHN_2$) maye halında olur, mürəkkəb amidlər isə bərk xassəli maddələrdir. Şəkər çuğundurunun tərkibində qlütamin və asparagin aminturşularının müvafiq amidlərinə rast gəlinir. Amidlər şəkər çuğundurunun əmələ gəlməsində, formalasmasında, yetisməsində mühüm rol oynayırlar. Tam yetişmiş şəkər çuğundurunda ümumi azotlu maddələrin 2-3%-i amidlərdən təşkil edilmisdir. Şəkər çuğundurunda aminturşularının aminsizləsməsi prosesində ammonyakın hesabına müxtəlif amidlər (qlütaminamid, asparaginamid) və digərləri əmələ gəlir (Qorçiyeva, 2015:17).

Peptid molekullarının əmələ gəlməsi üçün aminturşular karboksil (-COOH) və amin qrupları -(NH2) vasitəsilə birləsib peptid tipli (-CO-NH) rabitə yaradırlar. Peptidlər bioloji aktivliyə malik olub, canlı orqanizmlərdə mühüm funksiyanı yerinə yetirirlər. Bitkilərdə, o cümlədən şəkər çuğundurunda xeyli fitohormonlar vardır ki, onlar peptidlərdən sintez olunaraq, bəzi fermentlərin təsir mexanizmini tənzimləyirlər .

Hal-hazırda dünyanın bir çox ölkələrində aspartamdan Pepsi, Kola, limonad, saqqız və digər uşaq yeməklərinin hazırlanmasında istifadə olunur. Kimyəvi təbiətinə görə dipeptidin metil efiri asparagin və fenilalanin adlanan aminturşusunun metil spirt ilə birləşməsindən əmələ gəlmişdir.

Aspartam və dipeptidin metil efiri 80 $^{0}$C temperaturda hidroliz olunaraq iki aminturşusuna və metil spirtinə ayrılır. Bu zaman şirinlik xüsusiyyəti pozulur. Konserv sənayesində də pasterizasiya və sterilizasiya rejimlərindən istifadə olunduğuna görə onların istehsalında bu dipeptiddən istifadə edilmir (Shpaara, 2000:259). Əks halda məhsulun tərkibində metil spirti əmələ gəlir ki, bu da yüksək dozada toksiki təsirə malikdir.

**Zülallar.** Şəkər çuğundurunun tərkibində azotlu maddələrin ən geniş yayılmış nümayəndəsi zülallardır. Zülallar hüceyrə qurulusunun əsasını təşkil edir. Onlar şəkər çuğundurunun şirəsinə nisbətən qabıq və lətli hissədə çox miqdarda olurlar. Zülalların ən əsas bioloji xüsusiyyətlərindən biri də, toxumalarda parçalanaraq orqanizmin həyat fəaliyyəti üçün lazım olan enerji vermək qabiliyyətidir. Zülallar çoxlu sayda aminturşularının qalıqlarından təşkil olunmuşdur. Baxmayaraq ki, zülal molekullarının əmələ gəlməsində yalnız 20 amin turşusu iştirak edir, ancaq onun bütün canlı orqanizmlərdə, o cümlədən bitkilərdə çoxlu sayda izomerləri mövcuddur.

Zülallar təsnifatına görə iki qrupa bölünürlər: sadə zülallar, bunlara proteinlər

deyilir və mürəkkəb zülallar, bunlara isə proteidlər deyilir. Şəkər çuğundurun tərkibində sadə zülallardan – albuminlərə, qlobulinlərə, prolaminlərə, qlütelinlərə, protaminlərə, histonlara rast gəlinir. Onlar ən çox şəkər çuğundurunun qabığında, lətli hissəsində olurlar. Şəkər çuğundurunun qabığında ən çox albuminlərə, lətli hissəsində isə prolaminlərə və qlütelinlərə təsadüf olunur.

Şəkər çuğundurunun tərkibində olan mürəkkəb zülallar aktiv fermentlərdən və qeyri fermentativ aktivliyə malik olan proteinlərdən təşkil olunmusdur. Şəkər çuğundurunun tərkibində mürəkkəb zülallardan qlikoproteidlər daha çoxluq təşkil edirlər (Cəfərov, Quliyev, Səfərov, 2000: 364). Onların tərkibində aktiv qrup kimi karbohidratların nümayəndələrindən heksozalara, pentozalara, hətta qlükozaminə də rast gəlinir.

**Vitaminlər.** Şəkər çuğunduru bioloji aktiv maddə olan vitaminlərlə də zəngindir. Vitaminlər bütün canlı orqanizmlərdə çatışmadıqda maddələr mübadiləsi pozulur. Şəkər çuğundurunun qabıq və lətli hissəsi şirəyə nisbətən vitaminlərlə daha zəngindir.

Şəkər çuğundurunun tərkibində həm yağda, həm də suda həll olan vitaminlərə

təsadüf olunur. Şəkər çuğundurunda yağda həll olan vitaminlərin əsasən provitaminlərinə təsadüf olunur. Məsələn, A vitamini şəkər çuğundurunun tərkibində olmur. Ancaq onun tərkibində karotinoidlərin nümayəndəsi olan karotin olur. Karotinlər bitkilərdə α, β, γ -formasında olur. İnsan və heyvan orqanizmində karotinaza fermentinin təsiri ilə β -karotindən iki molekul A vitamini sintez olunur. Şəkər çuğunduru B qrup vitaminlərindən $B_1$(tiamin), $B_2$ (riboflavin), $B_3$ (pantoten turşusu), $B_6$ (piridoksin), $B_9$ (fol turşusu), C (askorbin turşusu), P (rutin), PP (nikotin turşusu) və digər suda həll olan vitaminlərlə də zəngindir. Bu vitaminlər suda yaxşı həll olduğuna görə diffuziya şirəsinin alınması zamanı lətli və qabıq hissədən şirəyə keçirlər. Suda həll olan vitaminlər şəkər çuğundurunun həm bərk hissəciklərində, həm də şirəsində olurlar.

**Fermentlər.** Bütün canlı orqanizmlərdə bas verən maddələr mübadiləsi prosesi fermentlərin iştirakı ilə getdiyinə görə şəkər istehsalında da onların mühüm əhəmiyyəti vardır. Belə ki, şəkər çuğundurunun əmələ gəlməsində, formalaşmasında, yetişməsində bas verən fotosintez, tənəffüs və digər proseslər canlı hüceyrələrdə fermentlərin iştirakı ilə gedir. Ona görə də şəkər çuğundurunun tərkibi qida komponentləri ilə, o cümlədən şəkərlə zəngin olması fermentlərlə sıx əlaqədardır (Müslümzadə, Nəbiyev, Tağıyev, Qasımova, 2007:170-180; Nəbiyev, Qasımova, 2011:97-198).

Sitolitik ferment preparatları sellülozu, protolitik ferment preparatları zülalları, pektolitik ferment preparatları pektini hidroliz edir. Nəticədə mürəkkəb biopolimerlər sadə birləşmələrə

